## Şərəfli bağça



Bağça deyilən yer Peyğəmbərin – sallallahu aleyhi va səlləm – evindən xütbə verdiyi minbərə qədər olan məkandır. Müsəlmanlara görə onun özünəməxsus fəziləti vardır. Rəsulullahın – sallallahu aleyhi va səlləm – zamanında onun arxasında qərib və yoxsul insanlar üçün məkan var idi. Onlara Suffə əhli deyilirdi.

## Peyğəmbər hücrəsi



Bu yerdə Peyğəmbərin – sallallahu aleyhi va səlləm – və iki böyük səhabəsinin məzarı yerləşir. Peyğəmbər – sallallahu aleyhi va səlləm – məscidə bitişik olan evində dəfn olunmuşdur. Sonradan isə onun evi məscidin ərazisinə daxil edilmişdir.

## Yaşıl qübbə



Peyğəmbərin – sallallahu aleyhi va səlləm –məzarı olan yerin tavanı yaşıl qübbə ilə fərqləndirilib. Şəkilin arxa tərəfində görünən isə Bəqi məzarlığıdır ki, orada Muhəmmədin – sallallahu aleyhi va səlləm – minlərlə səhabəsi dəfn olunmuşdur.




# Peyğəmbər məscidi

Dünyanın ən böyük məscidlərindən biri və İslamda ikinci ən müqəddəs məkandır. Bu məscidi Muhəmməd Peyğəmbər – sallallahu aleyhi va səlləm – 622-ci ildə Mədinə şəhərinə hicrət etdikdən sonra evinin yanında inşa etdirmişdir. Məscidin yeri iki yeniyetmə oğlana məxsus idi və orada xurma qurudulurdu. Peyğəmbər – sallallahu aleyhi va səlləm – həmin torpağı onlardan satın aldı. Sonra orada xurma ağacının gövdələrindən uzunluğu və eni 50 metr olan məscid inşa etdi. Məscidin tavanında da ağaclardan istifadə etdi. Məscidin qurtaracağında isə qərib və yoxsul insanlar üçün məkan təyin etdi.



Peyğəmbər məscidini səmadan çəkilmiç şəkildən seyr et

**17**
Müəzzinlərin sayı 17-dir

**333.327**
Məscidin sahəsi ətraf sahəsi ilə birlikdə 333.3.27 kvadrat metrdir

**10**
Məscidin 10 minarəsi vardır

**1**
Məsciddə və onun sahəsində eyni anda 1 milyon adam namaz qıla bilir

## Quranın əzbərlənməsi



Quranda əsas məqsəd onun aramla oxunaraq ona əməl olunmasıdır. Müxtəlif yerlərdəki müsəlmanlar müxtəlif yaşlarda Quranı əzbərləməyə və onu öyrənməyə, üstəlik onu öz övladlarına öyrətməyə çalışır. Hər il dünyada yarım milyondan çox yeni Quran hafizinin artdığı təxmin olunur.

## Səslə qorunma



Müsəlman alimləri Quranın Rəsulullahın – sallallahu aleyhi va səlləm – tilavət etdiyi kimi, ən dəqiq şəkildə səsləndirilməsi üçün böyük zəhmət sərf etmişlər. Alimlər özlərindən əvvəlki alimlərdən Rəsulullahadək – sallallahu aleyhi va səlləm – dinləmə yolu ilə bunu mənimsəmişlər. Yəqinliklə söyləyə bilərik ki, bu gün İndoneziyadakı müsəlman uşaq Quranı Məkkədə 15 əsr öncə oxunduğu kimi oxuyur. Bu elm Təcvid adlanır.

## Yazılı qorunma



Quranın bu günkü yazılışı Rəsulullahın – sallallahu aleyhi va səlləm – zamanında yazıldığı kimidir. O vaxt 23 səhabə Rəsulullahın – sallallahu aleyhi va səlləm – hüzurunda, ona vəhy nazil olunduqca Quranı yazardılar. Onun vəfatından sonra isə Quran bir yerə cəm olunmuş və bundan sonra da onun hərf və səslərinin yazılışı qaydaları haqqında Quranın yazılışı adlı müfəssəl bir elm meydana gəlmişdir.

# Hifz olunan Quran

Quran müsəlmanların kitabıdır və onlar etiqad edirlər ki, o, Allah tərəfindən Muhəmməd Peyğəmbərə – sallallahu aleyhi va səlləm – nazil olunmuş Allah kəlamıdır. Quran insanlara hidayət verən, haqqı batildən ayırd edən bir kitabdır və onlara nə üçün yaradıldıqlarını izah edib, onlar üçün xeyirli olan qanunlara, habelə ən gözəl və ən kamil əxlaqi keyfiyyətlərə səsləyir.

**23**
Quran 23 il ərzində nazil olmuşdur



Quran oxuyan uşağı seyr et

**114**
Quran surələrinin sayı 114-dür

## Azanın mənası



Azan İslam dəvətinin əsasıdır. Onun sözlərində İslamın əsası hesab olunan şəhadət yer alır. Orada deyilir ki, Allahdan başqa ibadət haqqına malik məbud yoxdur və ibadətlər Allahın Rəsulu Muhəmmədin – sallallahu aleyhi va səlləm – buyurduğu kimi olmalıdır. Bu da Muhəmməd Allahın rəsuludur şəhadətidir.

## Ən şərəfli iş



Azan vermək ən şərəfli işlərdən biri hesab olunur və müəzzinlər Uca Allah tərəfindən böyük bir əcrə nail olur. Peyğəmbərin – sallallahu aleyhi va səlləm – sünnəsində azan verməyin böyük fəzilətləri haqqında dəlillər varid olmuşdur. Onlardan biri də Qiyamət günü insanların, müəzzinləri uzun boylarından tanımaları olacaq.

## Oruc tutan üçün azan



Müsəlman olan kəs oruc tutmağa niyyət etdikdə, sübh namazının azanını eşidincə bir sıra əməllərə son verir və məğrib namazının azanını eşidənədək orucunu davam etdirir.



**24**
Məkkə hərəminin müəzzinlərinin sayı 24-dür

**4**
Dünyadakı müəzzinlərin sayı təqribən 4 milyondur

**15**
Azanın cümlələrinin sayı 15-dir



Azanın 8 məqamı, müəzzinlərin əda formaları müxtəlifdir və onları sayıb bitirmək mümkünsüzdür… Azanı dinlə.

# Azan

Müsəlmanları namaza səsləyən çağırış azan adlanır. Fərz buyurulmuş beş vaxt namazın əvvəlində azan verilir. Bunun üçün müəzzin (azanı verən adam) hündür bir yerdə, minarədə və ya məscidin sahəsində azan verir.

## Namazda Kəbəyə yönəlmə

Dünyanın hər bir yerində müsəlmanlar namaz qılmaq üçün Allahın əmrini yerinə yetirərək Kəbəyə tərəf yönəlirlər. Beləcə onlar birgə şəkildə vahid mərkəzə tərəf istiqamətlənirlər.



## Kəbənin örtüyü

Kəbənin şərəfli örtüyü Allahın evinə edilən ən əsas hörmət və ehtiramın təzahürüdür. Rəsulullahın – sallallahu aleyhi va səlləm – peyğəmbərliyindən öncə də insanlar Kəbəni örtərdilər və onlar bu tendensiyanı fərqli rənglərdə davam etdirmişlər. Günümüzdə Kəbə, üzərinə qızıl suyuna çəkilmiş saplarla Quran ayələri nəqş edilmiş qara ipək parça ilə örtülür. Örtük ildə bir dəfə Həcc mövsümü zamanı dəyişdirilir.



## Qara daş

Kəbənin cənub-şərqində yerləşir. Müsəlmanlara görə onun özünəməxsus yeri vardır. Onlar təvafı onun yanından başlayır, hər dəfə təvaf etdikdə onu öpür, əllərini ona sürtür və ya ona tərəf işarə edirlər. Bununla belə müsəlmanlar etiqad edirlər ki, o, nə zərər verir, nə də fayda.





# Kəbə

Məkkə şəhərində, Məscidul-həramın ortasında yerləşən dördbucaqlı formasında bir tikilidir. Müsəlmanlar namaz və Allahın buyurduğu digər ibadətləri yerinə yetirdikdə ona tərəf üz tuturlar. Onu Allahın peyğəmbəri İbrahim və oğlu İsmayıl – aleyhiməssalam – İzzət və Cəlal Sahibi olan Allahın əmri ilə inşa etmişlər. Sonradan o, dəfələrlə yenidən bina edilmişdir.

### Zəmzəm quyusu

Zəmzəm quyusunun əsl yeri Kəbədən 20 metr aralıdadır. Müsəlmanlar onun suyunu bərəkətli hesab edir və etiqad edirlər ki, bu Allahın İsmail aleyhissalama kiçik yaşlarında bəxş etdiyi bir kəramətdir.

### Kəbənin qapısı

Kəbənin qapısından keçməklə insan onun içərisinə daxil olur və ya onun üzərinə qalxa bilir. Onun qapısı yerdən 2.2 metr yüksəklikdədir.

### İbrahimin məqamı

Bu yer İbrahim aleyhissalamın üzərində duraraq Kəbəni inşa etdiyi yerdir. Rəsulullah – sallallahu aleyhi va səlləm – təvafı bitirdikdən sonra onun arxasında namaz qılardı.


Kəbəni yaxından seyr et


Məscidul-həramı canlı yayımla izlə

# Nur dağı

Nur dağı Məkkədə Məscidul-həramın şərqində yerləşən bir dağdır və onun özünəməxsus tarixi məqamı vardır. Vəhy nuru məhz həmin yerdə Rəsulullaha – sallallahu aleyhi va salləm – nazil olmağa başlamışdır. Bu dağda İslamın şüarlarından hər hansı biri yoxdur.

## Hira mağarası

Hira mağarası Peyğəmbərin – sallallahu aleyhi va səlləm – peyğəmbərlikdən öncə ardıcıl gecələrdə xəlvətdə olduğu mağaradır. Həmin məkanda Cəbrail əleyhissalam nazil olaraq Allahın risaləsini Muhəmmədə – sallallahu aleyhi va səlləm – çatdırmışdır.



## Quranın nazil olması

Bu dağın üzərində fərqli bir tarixi an yaşanmışdır. O da Quranın Muhəmmədə – sallallahu aleyhi va səlləm – nazil olunduğu vaxtdır. Həmin kitab müsəlmanların həyatında bir düstur, hidayət verən və müəllim rolunu oynayır.



## Oxu!

(Oxu!) Qurandan Allahın elçisi Muhəmmədə – sallallahu aleyhi va səlləm – nazil olunmuş ilk sözdür və göstərir ki, elm söz və əməldən daha öndədir.





Nur dağının göydən görünüşünü seyr et

**642**
Dəniz səviyyəsindən 642 metr yüksəklikdə yerləşir

**5**
Dağın sahəsi 5 kilometrdir və dəvənin hürgücü formasındadır, özü də olduqca sıldırım qayalı və sürüşkəndir.

**40**
Rəsulullaha – sallallahu aleyhi va səlləm – vəhy nazil olunarkən onun 40 yaşı var idi.

**4**
Dağ, Məscidul-həramdan 4 kilometr aralıda yerləşir.

## İbrahimin çağırışı

Allah öz peyğəmbəri İbrahimə aleyhissəlama Kəbəni inşa etdikdən sonra əmr etmişdi ki, yerin müxtəlif bölgələrindən insanları ora həcc ziyarətinə səsləsin. Hər il dünyanın müxtəlif ölkələrindən çoxsaylı müsəlmanlar bu çağırışa cavab verirlər.



## Aləm cavab verir

Muhəmməd Peyğəmbər – sallallahu aleyhi va səlləm – yüz min səhabəsi ilə birlikdə həcc etmiş, üstəlik, tövhid, Allahın evinə diqqət və ümmətini həccə səsləmək kimi məsələlərdə Allahın peyğəmbəri İbrahim aleyhissəlamın yolu ilə getdiyini təkidlə bildirmişdir.



## Həccin sirləri

İslam təkidlə bildirir ki, həccin təfsilatı ilə yerinə yetirilməsindəki təcrübəsinin sirri Allahın həm qəlblə, həm də dillə zikr olunması, Uca və Nöqsansız Allaha zəlilcəsinə möhtaclığın izhar edilməsidir.



# Məkkəyə həcc

Həcc İslamın rüknlərindən beşincisidir. Bu müxtəlif irqlərin və təbəqələrin eyni rəngli libasda bir yerə gəldikləri səfərdir. Onlar bir ağızdan: "Ləbbeyk, Allahummə, ləbbeyk" (yəni, biz Sənin hüzurundayıq, ey Rəbbimiz!) deyirlər. Müsəlman həcc zamanı müxtəlif hallarda, müxtəlif feillərlə və sözlərlə Allahı zikr edir, Ona möhtac olduğunu izhar edir.

### Həcc vaxtı gediş






Həcdən görüntüləri seyr et

**30** — 30 min həkim və tibb işçisi

**192** — 192 min işçi qüvvəsi

**6** — Həccin 6 günü

**3** — Hər il 3 milyon zəvvar

LAUNCHING CURiOSiTY JUST SCAN IT

## Məscid və cəmiyyət



Məscid, müsəlmanların birliyi və parçalanmamaları üçündür. Məscid hər kəs üçündür. Burada ağ və ya qara dərili, yaxud əsmər olan, varlı ilə kasıb, savadlı və ya savadsız olan kimsələr arasında heç bir fərq yoxdur. Məsciddə cəmiyyətin bütün təbəqələri bərabər olur, yalnız təqvası daha çox olanın məqamı yüksəkdir.

## Nur məscidi



Nur məscidi Yeni Zelandiyada 1981-ci ildə tikilmişdir. Dünyada sutka ərzində üzərinə ilk günəş şüası dəyən məscid budur. Hər gün azan və sübh namazı bütün məscidlərdən əvvəl burada icra olunur.

## Ən qədim minarə



Minarələr məscidlərin əsas əlamətlərindən biridir. Onun möhtəşəm görüntüsü uzaqdan bəlli olur.
Səkkizinci-doqquzuncu əsrlərdə inşa edilmiş Böyük Qayruvan məscidinin minarəsi ən qədim minarələrdən biri hesab olunur və günümüzədək qalmaqdadır.

# Məscid



Bu, müsəlmanların öz namazlarını qıldıqları məkandır. Peyğəmbər – sallallahu aleyhi va səlləm – Mədinəyə hicrət etdikdən sonra inşa etdirdiyi ilk tikili məscid idi. Məscid Allahı zikr etmək, dinin qayda və əhkamlarını öyrənmək üçün müəyyən edilmiş yerdir.



Dünyadakı müxtəlif məscidlərin dizaynı

**800** min
İndoneziyadakı məscidlərin sayı

**4** milyon
dünyadakı məscidlərin təqribi sayı

## Dünyadakı məscid dizaynları

**Malidə** məscid dizaynı


**Hindistanda** məscid dizaynı


**Fransada** məscid dizaynı


**Çində** məscid dizaynı


## Hərəm

Hərəm – səbəbindən asılı olmayaraq döyüşün, ovun, insanın əkmədiyi ağacları kəsməyin qadağan olunduğu yerdir. Onun müəyyən hüdudları vardır ki, onu ərəblər İslamdan öncə də bilirdilər. Onlar İbrahimin – əleyhissalam – dinindən onu mənimsəmiş, Rəsulullah – sallallahu aleyhi va səlləm – də onu təsdiq etmişdir.



## Qəlblərin bağlılığı

Quranda xəbər verilir ki, İbrahim peyğəmbər – əleyhissalam – Kəbə evini inşa etdikdə Allaha dua etmişdir ki, insanların qəlbi bu evə bağlı olsun, ora gedib həcc ziyarəti etməyə həris olsunlar. Bu gün ora bir milyard yarımdan çox müsəlmanın qəlbinin bağlandığı bir məkandır.



## Məkkə

İslamda ən əzəmətli şəhər, Allahın rəsulu Muhəmməd – sallallahu aleyhi va səlləm –orada anadan olmuş, orada böyümüş, dəvətini orada başlamışdır. Məkkəyə insanlar izdihamla gəlib toplandıqları üçün belə adlanmışdır.






# Məscidul-həram

İslamda ən böyük məsciddir və Səudiyyə Ərəbistanı Krallığında Məkkə şəhərinin ortasında yerləşir. Məscidin ortasında İbrahim peyğəmbərin – əleyhissalam – inşa etdiyi Kəbə yerləşir ki, o da insanlar üçün tikilmiş ilk evdir.

**22**
Hər il Məkkəni 22 milyon zəvvar ziyarət edir

**2**
Məkkə həramının hüdudlarında 2 milyon adam namaz qıla bilir.

**179**
Məscidul-həramın 179 qapısı vardır


Məscidul-həramı canlı yayımla izlə


Məscidul-həramın səmadan görüntüsünü izlə

## **Rəsulullahın** – sallallahu aleyhi va səlləm – **evi**



Muhəmməd peyğəmbər – sallallahu aleyhi va səlləm – evini kərpicdən və xurma ağacının gövdələrindən inşa etmişdi. Evin iki qapısı var idi – biri qərb istiqamətində, ikincisi isə şimal istiqamətində. Qapıların çərçivələri yox idi və əllə döyülürdü.

## **Rəsulullahın** – sallallahu aleyhi va səlləm – **ev əşyaları**



Rəsulullahın – sallallahu aleyhi va səlləm – evində yoxsul möminlərin evində olan ləvazimatlardan savayı heç bir əşya yox idi. Tarix bizlərə nəql edir ki, ərəblərin rəhbərlərindən biri Adiy ibn Hatim nəsrani idi. Bir dəfə o, Mədinəyə gəldi və Rəsulullah – sallallahu aleyhi va səlləm – onu qəbul etdi. O vaxt Peyğəmbər – sallallahu aleyhi va səlləm – üzərində otursun deyə qonağına bir şey təqdim edə bilmədi. Lifdən hazırlanmış bircə döşəkcə tapdı və onu da qonağı otursun deyə, ona təqdim etdi. Rəsulullah – sallallahu aleyhi va səlləm – özü isə yerdə oturdu.

## **Yaşıl qübbə**



Rəsullahın – sallallahu aleyhi va səlləm – bu günkü məzarı tarix boyu qorunsun deyə inşa edilmiş hasarla əhatə olunmuşdur. Üzərində isə 1279-cu ildə inşa edilmiş Yaşıl qübbə vardır. Əvvəllər onun rəngi göy idi, sonradan 1873-cü ildən yaşıl rəngi almışdır.



Ömər ibn Xəttabın (Allah ondan razı olsun) məzarı

Əbu Bəkr əs-Siddiqin (Allah ondan razı olsun) məzarı

Rəsulullahın – sallallahu aleyhi va səlləm – məzarı

## **Burada dəfn olunmuşdur**

İslam peyğəmbəri Muhəmmədin – sallallahu aleyhi va səlləm – məzarı burada yerləşir. O, 8/6/632-ci ildə vəfat etdiyi evində dəfn olunmuşdur. Son nəfəsini zövcəsi Aişənin –radiyallahu anhə – qucağına söykənmiş halda, Uca məqamdakı dostları istəyirəm – deyərək almışdır. Sonra onun yanında ən xeyirli səhabələri – Rəsulullahın – sallallahu aleyhi va səlləm – xəlifəsi Əbu Bəkr əs-Siddiq və ikinci xəlifə Ömər ibn əl-Xəttab – radiyallahu ənhumə – dəfn olunmuşlar. Müsəlmanlar Peyğəmbər məscidini ziyarət edərkən Rəsulullahı – sallallahu aleyhi va səlləm – salamlayırlar.



Peyğəmbər məscidini səmadan seyr et